# DƏSTƏMAZ



Dəstəmazsız namaz məqbul sayılmır. Dəstəmaz mütləq təmiz, yəni orijinallığını itirməmiş su ilə alınmalıdır. Misal olaraq dəniz, quyu, çay və bulaq sularını qeyd etmək olar.
Diqqət! Az miqdarda su murdar şeylərin qarışması ilə dərhal murdar olur. Çox miqdarda, yəni 210 litrdən çox olan su isə dərhal murdar olmur. Əgər suyun rəngi, dadı və ya iyi dəyişərsə o zaman murdar sayılır.



Dəstəmaz "bismillah" kəlməsi ilə başlanır. Hər dəfə dəstəmaz alarkən əvvəlcə əlləri biləklərə qədər yumaq yaxşıdır. Səhər yuxudan durduqda isə əlləri mütləq yumaq lazımdır.
Diqqət! Dəstəmaz alarkən hər əzanın üç dəfədən çox yuyulması bəyənilmir.



Ağızı bir dəfə yaxalamaq vacibdir. Üç dəfə yaxalamaq isə daha yaxşıdır.
Diqqət! 1. Ağızın yaxalanması üçün suyu sadəcə ağıza almaq kifayət deyil. Suyu ağızda mütləq dövr etdirmək lazımdır. 2. Ağızı yaxalayarkən misvakdan istifadə etmək yaxşıdır.



Buruna bir dəfə su almaq vacib, üç dəfə isə yaxşıdır.
Diqqət! Burunu təmizləmək üçün sadəcə su vurmaq kifayət deyil. Suyu mütləq nəfəsi ilə buruna idxal etməlidir. Sonra suyu əl ilə deyil, nəfəsi ilə geri qaytarmalıdır.



Üzü bir dəfə yumaq vacib, üç dəfə yumaq isə yaxşıdır. Üzün yuyulması dedikdə, bir qulaqdan digər qulağa, çənə sümüyünün aşağı hissəsindən baş tüklərinin bitdiyi hüduda qədər yumaq .nəzərdə tutulur. Bu vacibdir.
Diqqət! Seyrək bitmiş saqqala su yeritmək vacib, sıx bitmiş saqqala su yeritmək isə müstəhəbdir (yaxşıdır).



Qollar barmaqların ucundan dirsəklərə qədər bir dəfə yuyulur. Bir dəfə yumaq vacib, üç .dəfə isə yaxşıdır.
Diqqət! Birinci sağ, sonra sol əlini yumaq müstəhəbdir (yaxşıdır).



Sonra başın hər tərəfinə məsh çəkilir. Məsh çəkərkən şəhadət barmağı qulaq boşluğuna daxil edilir və baş barmaqla qulağın arxasına sürtülür. Bunu yalnız bir dəfə etmək lazımdır.
Diqqət! 1. Başın məsh çəkilən vacib hissəsi alından ənsəyə qədərdir. 2. Saçın uzanan hissəsinə məsh etmək vacib deyildir. 3. Əgər başda tük yoxdursa baş dərisinə məsh çəkilir.



Sonra hər iki ayaq topuqlarla birlikdə bir dəfə yuyulur. Bir dəfə yumaq vacib, üç dəfə isə yaxşıdır

## Önəmli məlumatlar :

1) Dəstəmazda yuyulan əzalar dörddür:
a) Ağız ilə burunun yaxalanması və üzün yuyulması. b) İki əlin yuyulması.
c) Başa və qulaqlara məsh etmək. d) Ayaqları topuqlarla birlikdə yumaq. Dəstəmaz əzaları deyilən ardıcıllıqla yumaq vacibdir. Bu ardıcıllığın pozulması dəstəmazı batil edir

2) Əzaların yuyulması zamanı uzun fasilə vermək olmaz. Əzanı yuyarkən, özündən .2 əvvəlki əza quruyana qədər fasilə vermək dəstəmazı pozur.

3) Dəstəmazdan sonra bu duanı demək sünnədir: "Əşhədu əllə iləhə illəllah vahdəhu lə şərikə ləhu və əşhədu ənnə Muhəmmədən abduhu va rasuluh". Şəhadət verirəm ki, Allahdan başqa ibadətə haqqı olan heç bir məbud yoxdur. O təkdir, şəriki yoxdur Şəhadət verirəm ki, Muhəmməd Onun qulu və elçisidir.